AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ • 1921

QƏZET 1958-ci İLDƏN NƏŞR OLUNUR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Yanvar 2019
№ 01 (1098)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## İsmayıl Şıxlının 100 illik yubileyinin qeyd edilməsi haqqında
## *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*



2019-cu ilin mart ayında Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, istedadlı nasir, tanınmış ədəbiyyatşünas, pedaqoq və ictimai xadim, Xalq yazıçısı İsmayıl Qəhrəman oğlu Şıxlının anadan olmasının 100 illiyi tamam olur.

İsmayıl Şıxlı koloritli xarakterlər və yüksək mənəvi-əxlaqi keyfiyyətlərə malik surətlərlə zəngin yaradıcılığı ilə Azərbaycan xalqının bədii fikir salnaməsinə yeni parlaq səhifə yazmış söz ustalarındandır. Ədibin məşhur “Dəli Kür” romanı ictimai şüurda dönüşə və özünüdərkə yol açan mühüm ədəbi-mədəni hadisə kimi qiymətləndirilmişdir. Sənətkarın klassik irsin ənənələrini davam etdirməklə və folklor xəzinəsindən bəhrələnməklə meydana gətirdiyi əsərlərdə dərin həyat fəlsəfəsi öz dolğun ifadəsini tapmışdır. Üslubun mükəmməlliyi, bədii dilin obrazlılığı, daxili aləmin təsvirinin genişliyi və əlvanlığı İsmayıl Şıxlı nəsrinə xas olan səciyyəvi cəhətlərdir. Taleyüklü məsələlərə münasibətdə daim vətəndaş ziyalı mövqeyi nümayiş etdirmiş İsmayıl Şıxlının fəaliyyəti bütövlükdə azərbaycançılıq məfkurəsinə sədaqətin və ənənəvi dəyərlərə ehtiramın bariz nümunəsidir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, müasir Azərbaycan ədəbiyyatının inkişafı naminə təqdirəlayiq xidmətlər göstərmiş Xalq yazıçısı İsmayıl Şıxlının anadan olmasının 100-cü ildönümünün qeyd olunmasını təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Respublikasının Mədəniyyət Nazirliyi və Azərbaycan Respublikasının Təhsil Nazirliyi, Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, Xalq yazıçısı İsmayıl Şıxlının 100 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 28 yanvar 2019-cu il*

## ADPU Türkiyə universitetləri ilə əlaqələrini genişləndirir



Yanvarın 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov ölkəmizin Türkiyədəki Səfirliyinin Təhsil müşaviri Nəcibə Nəsibova ilə görüşüb. Görüşdə ADPU-nun Tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisləri Lətif Kəngərlinski, Günay Məhərrəmova, rektorun köməkçisi Riyad Rüstəmli iştirak ediblər.

Rektor Cəfər Cəfərov görüşdə ADPU-da həyata keçirilən islahatlar, infrastrukturun yenilənməsi, təhsilin keyfiyyətinin yaxşılaşdırılması, təhsilin beynəlmiləlləşdirilməsi, beynəlxalq əlaqələrin genişləndirilməsi, xarici dilin tədrisinin səviyyəsinin yüksəldilməsi sahəsində gerçəkləşən tədbirlər barədə ətraflı məlumat verib. Rektor qeyd edib ki, son illər dövlət səviyyəsində həyata keçirilən tədbirlər nəticəsində Azərbaycan cəmiyyətində müəllim peşəsinə maraq xeyli artıb. Belə ki, 2018-2019-cu tədris ilində ölkəmizdə 500-dən yüksək bal toplayan 2090 nəfər gənc müəllimlik peşəsini seçib. 500-dən yüksək bal toplayan 566 nəfər gənc ali təhsil almaq üçün ADPU-nu seçib. Bu, son 3 il ərzində ADPU-nun timsalında 22 dəfə artım deməkdir. ADPU öz beynəlxalq əlaqələrində Türkiyə universitetləri ilə əlaqələrə xüsusi önəm verir və bu əlaqələri gələcəkdə daha da genişləndirmək niyyətindədir. ADPU-da Türk araşdırmaları elmi-tədqiqat laboratoriyası, TÜRKSOY kafedrası, türkiyəli tələbələrin idarə heyəti fəaliyyət göstərir. ADPU müxtəlif beynəlxalq layihələrdə, o cümlədən inklüziv təhsil sahəsində iki böyük layihədə iştirak edir. Kompleks şəkildə həyata keçirilən islahatlar ADPU-nu gələcəkdə Türkiyə üçün daha cəlbedici edəcəkdir.



Təhsil müşaviri Nəcibə Nəsibova son illər ADPU-da həyata keçirilən islahatları diqqətlə izlədiyini və bu islahatları təqdir etdiyini bildirib. Türkiyədə müəllim peşəsinə marağın böyük olduğunu qeyd edən Nəcibə Nəsibova ADPU-da təhsil alan türkiyəli tələbələrə göstərilən diqqət və qayğıya görə universitet rəhbərliyinə təşəkkür edib. O, ADPU-nun Türkiyə universitetləri ilə əlaqələrinin daha da genişləndirilməsinə dəstək verməyə hazır olduğunu vurğulayıb.

Görüşdə inklüziv təhsil sahəsində əməkdaşlıq, bu sahədə qabaqcıl beynəlxalq təcrübənin, həmçinin Türkiyə təcrübəsinin öyrənilib tətbiq edilməsi, ikili diplomlar, ADPU-nun təhsildə fərqlənən tələbələrinin Türkiyədə pedaqoji təcrübə keçmələri və digər məsələlər müzakirə olunub, müvafiq qərarlar qəbul edilib.

Sonda rektor Cəfər Cəfərov Nəcibə Nəsibovanı universitetin tədris binası, o cümlədən Türk araşdırmaları elmi-tədqiqat laboratoriyası və TÜRKSOY kafedrası ilə tanış edib.

**Mənsur İbrahimli**

## Payız semestrinin imtahan sessiyası

Azərbaycan Respublikasının Təhsil naziri Ceyhun Bayramovun “İmtahan sessiyasının təşkili və keçirilməsi barədə” imzaladığı 11 dekabr 2018-ci il tarixli əmrdə ali və orta ixtisas təhsili müəssisələrində 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasını mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin edilməsi, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması, bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb lazımi tədbir görülməsi, eyni zamanda imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması öz əksini tapıb. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu əmrin icrası ilə bağlı müvafiq əmr imzalanıb. Payız semestrinin imtahan sessiyasında tələbələrin imtahan nəticələrinin qiymətləndirilməsində olan şikayətlərin araşdırılması və düzgün qiymətləndirilməsini təmin etmək məqsədilə 9 nəfərdən ibarət Apelyasiya Komissiyası yaradılıb. Apelyasiya Komissiyasının sədri siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqovdur. Apelyasiya Komissiyası ADPU-nun Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində, 240 nömrəli otaqda fəaliyyət göstərib. Apelyasiya Komissiyasının telefon nömrəsi 498-17-94-dür. Eyni zamanda payız semestrinin imtahan sessiyasının obyektivliyini və şəffaflığını təmin etmək məqsədilə 8 nəfərdən ibarət İmtahan Qərargahı yaradılıb. İmtahan Qərargahının sədri siyasi elmlər üzrə fəlsəfə doktoru, dosent Asif Axundovdur. İmtahan Qərargahı və qaynar xətt (qaynarxett@adpu.edu.az <mailto:qaynarxett@adpu.edu.az>.) də universitetin Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində, 205 nömrəli otaqda fəaliyyət göstərib. İmtahan Qərargahının telefon nömrəsi 498-19-04-dür.

Qeyd edək ki, payız semestrinin imtahan sessiyası yanvar ayının 4-dən fevral ayının 2-dək tərtib olunmuş cədvəl üzrə keçirilib. İmtahanlar ali təhsilin bakalavriat səviyyəsində I-III tədris ili tələbələri üçün yazılı formada, IV və əvvəlki illərdən olan tələbələr üçün isə spesifik fənlər istisna olmaqla, kompüter vasitəsilə test üsulu formasında, magistratura səviyyəsində isə yazılı şəkildə keçirilib. Payız semestrinin imtahan sessiyası Tədris Departamentinin İmtahan və monitorinq şöbəsi tərəfindən idarə olunub. Semestr imtahanlarında mütəşəkkilliyin təmin olunması məqsədilə Tədris Departamentinin ümumi təşkilatçılığı və koordinatorluğu ilə universitet üzrə 30 nəfər imtahan təşkilatçısı, o cümlədən 100-dək nəzarətçidən ibarət İmtahan İdarəetmə Qrupu yaradılıb. İmtahanların təşkili və imtahanlarla əlaqəli bütün funksiyaların icra edilməsi bu qrupa həvalə edilib. Şəffaflığın və obyektivliyin təmin edilməsi üçün rektora və prorektorlara e-poçtla birbaşa müraciət etmək, qəbula yazılmaq, İctimai Şuraya müraciət etmək, qaynarxett@adpu.edu.az və ADPU-nun rəsmi facebook səhifəsindən inboksa yazmaq, Tələbə Gənclər Təşkilatının xətti ilə tələbələrin rəylərinin öyrənilməsi, İmtahan Qərargahına və Apelyasiya Komissiyasına müraciət etmək imkanları təmin edilib, dekanlıqlarda tələbələrin qəbulları təşkil olunub. Bunlarla yanaşı, imtahanlara buraxılma, imtahanların təşkili, keçirilməsi qaydaları, imtahan nəzarətçilərinin vəzifələri, hüquqları və tələbələrin imtahanın gedişində hansı hərəkətlərə yol verməməli barədə elanlar vurulub. Apelyasiya Komissiyasının və İmtahan Qərargahının əlaqə telefonları bütün tələbələrə elan edilib, universitetin saytında və facebook səhifəsində yerləşdirilib. İmtahan Qərargahına daxil olan hər bir şikayətin qısa müddətdə çevik araşdırılıb təmin edilməsi, imtahanların təşkilində və gedişində mənfi hallara yol vermiş şəxslər barədə universitetin rəhbərliyinə mütəmadi məlumat verilməsi tapşırılıb.

(Davamı 2-ci səhifədə)

# Payız semestrinin imtahan sessiyası

(Əvvəli 1-ci səhifədə)

İmtahan sessiyasının çevikliyini təmin etmək məqsədilə fakültələr üzrə imtahan nəzarətçiləri təyin edilib. İmtahan nəzarətçiləri qeyri-ixtisas sahibləridir. İmtahanlar hər gün saat 9:00-da başlayıb, 17:30-da bitib. Yazılı imtahanlar gün ərzində 3 dəfə-saat 9:00, 12:00, 15:00-da keçirilib. Test üsulu ilə hər 45 dəqiqədən bir imtahanlar keçirilib. Gün ərzində ümumilikdə təxminən 3000 nəfər tələbə yazılı və test üsulu ilə imtahan verib.

Yazılı imtahanların yoxlanılması üçün xüsusi otaqlar ayrılıb. Yazılı imtahanlar başa çatdıqdan sonra yazılar şifrələnib, yoxlanılıb və qiymətlər təlimata uyğun olaraq tələbələrə elan olunub. İmtahanların nəticələri ADPU-nun İnternet saytına yerləşdirilib. İmtahandan aldığı qiymətlə razılaşmayan tələbələr Apelyasiya Komissiyasına, imtahanın gedişindən narazı qalan tələbələr isə İmtahan Qərargahına müraciət ediblər. Eyni zamanda valideynlərlə əlaqələrin yaradılmasına, təhsil ekspertlərinin və kütləvi informasiya vasitələri nümayəndələrinin ADPU-da olaraq imtahan prosesini izləmələrinə də xüsusi diqqət yetirilib.



ADPU-nun filialları və ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) imtahan sessiyasının gedişi haqqında mütəmadi olaraq Tədris Departamentinə və rektorluğa məlumat veriblər.

ADPU-nun rəhbərliyi auditoriyalarda olaraq imtahan prosesini müşahidə edib, öz tapşırıq və tövsiyələrini verib. Bütövlükdə ADPU-da payız semestrinin imtahan sessiyası tam şəffaf və obyektiv keçirilib.

**Mahirə Mustafayeva**

# Filologiya fakültəsində görüş

Yanvarın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin İngilis dili kafedrasının müəllimlərinin Azərbaycan Dillər Universitetinin (ADU) Dil və Tərcümə Xidmətləri Mərkəzinin əməkdaşları ilə görüşü keçirilib. Görüşün keçirilməsində əsas məqsəd ingilis dili müəllimlərinin peşəkarlıq təhsil məkanına inteqrasiya istiqamətində uğurlu addımlar atmasını qeyd ediblər və hazırda təhsilimizdə xarici dil biliklərinə verilən önəmin xarici dil müəllimlərindən yüksək bilik və bacarıq tələb etdiyini bildiriblər. Bu məqsədlə müəllimlərin TKT kimi beynəlxalq təlim kurslarına cəlb olunması vacibdir.



səviyyəsinin yüksəldilməsi, onların yeni təlim metodları ilə işləmək bacarığının artırılmasıdır. Bu məqsədlə Filologiya fakültəsinin dekanlığı və İngilis dili kafedrasının təşəbbüsü ilə müəllimlərin beynəlxalq TKT (Teaching Knowledge Test) sertifikatına yiyələnmələri üçün təlimlər təşkil olunub.

Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova və İngilis dili kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva öz çıxışlarında ADPU-nun dünya ali

Sonra ADU-nun Dil və Tərcümə Xidmətləri Mərkəzinin direktoru, dosent Fiyalə Abdullayeva və direktor müavini Elçin Hüseynov Mərkəzin fəaliyyət istiqamətlərindən danışarkən qeyd ediblər ki, Mərkəz British Council-la sıx əməkdaşlıq edir. Onlar vurğulayıblar ki, TKT təlim kursları artıq neçə illərdir ki, ADU-da keçirilir və təlimçilər BC-nin beynəlxalq dərəcəli təlimçiləridir. Ümid edirik ki, birgə əməkdaşlıq davamlı olacaq və müsbət nəticələr verəcək.

# Payız semestrinin imtahan sessiyasının monitorinqi

Yanvarın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyasının monitorinqi keçirilib. Monitorinqdə universitetdə yeni tərkibdə fəaliyyətə başlayan İctimai Şuranın sədri, Azərbaycan Mətbuat Şurasının sədr müavini, Beynəlxalq Avrasiya Mətbuat Fondunun prezidenti Ümid Mirzəyev, üzvləri: təhsil ekspertləri Kamran Əsədov, Nadir İsrafilov, Bütöv Azərbaycan Xalq Cəbhəsi Partiyası (BAXCP) sədrinin İctimai və siyasi məsələlər üzrə müavini Niyaməddin Orduxanlı, "Cəmiyyət və Vətəndaş Münasibətləri" İctimai Birliyinin sədri Əhməd Abbasbəyli, Vətəndaşların Əmək Hüquqlarının Müdafiəsi Liqasının sədri Sahib Məmmədov, "Moderator.az" internet saytının baş redaktoru Zülfüqar Hüseynzadə, "Məktəbgüşəsi.az" internet saytının baş redaktoru Məzahir Məmmədli, "Region plus" analitik jurnalının baş redaktoru Namiq Mayılov, "Konstitusiya" Araşdırmalar Fondunun nümayəndəsi Şahin Nəsrullayev, universitetin Ağsaqqallar Şurasının sədri, professor Malik Cəbrayılov, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Müasir Azərbaycan dili kafedrasının müdiri vəzifəsini icra edən, professor Buludxan Xəlilov və media nümayəndələri iştirak ediblər.

İctimai Şuranın üzvləri, təhsil ekspertləri, qeyri-hökumət təşkilatlarının təmsilçiləri, media nümayəndələri imtahan keçirilən zal və auditoriyalarda olaraq imtahan prosesini, həmçinin imtahan yazı işlərinin kodlaşdırıldığı otaqlarda olaraq imtahan yazı işlərinin yoxlanılmasını, Apelyasiya Komissiyasının və İmtahan Qərargahının fəaliyyətini müşahidə ediblər. Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov monitorinq iştirakçılarına imtahan sessiyasının təşkili və gedişi, imtahan qaydaları, imtahan prosesində şəffaflığın və obyektivliyin təmin edilməsi üçün həyata keçirilən məqsədyönlü tədbirlər haqqında ətraflı məlumat verib. Qeyd edib ki, yanvarın 4-dən yanvarın 11-dək 84 fəndən keçirilən imtahanlarda təxminən 15895 nəfər tələbə iştirak edib. Bu müddətdə 81 nəfər tələbə İmtahan Qərargahına müraciət edib. Bu müraciətlərin 76-ı yazılı qaydada verilən imtahanlardan, 5-i isə test üsulu ilə verilən imtahanlardan olub. Müraciətlər çevik şəkildə və diqqətlə araşdırılıb. Yazılı qaydada verilən imtahanlarla bağlı edilən 76 müraciətin 73-ü tələbələrin xeyrinə




həll edilib, 3 nəfər isə müvafiq məlumatlandırmadan sonra müraciətindən imtina edib. Test üsulu ilə verilən imtahanlarla bağlı edilən 5 müraciət tələbələrin xeyrinə həll edilib. 18 nəfər tələbə imtahan qaydalarını pozduqlarına görə protokllaşdırılıb, onların imtahan nəticələri ləğv edilib və bu barədə müvafiq fakültə dekanlarına məlumat verilib.

Apelyasiya Komissiyasına isə yazılı qaydada verilən imtahanlarla bağlı 422 müraciət daxil olub. Yazılı qaydada verilən imtahanlarla bağlı edilən 422 müraciətdən 216-ı araşdırılıb. 63 müraciət tələbələrin xeyrinə həll edilib. Test üsulu ilə verilən imtahanlarla bağlı edilən 6 müraciətdən 4-ü araşdırılıb. 2 müraciət tələbələrin xeyrinə həll edilib. ADPU-nun filialları və ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) imtahan sessiyasının gedişi haqqında mütəmadi olaraq Tədris Departamentinə və rektorluğa məlumat verirlər.

Monitorinq iştirakçıları ilə söhbət zamanı tələbələr şəffaf və obyektiv imtahan mühitinin yaradılmasından razı qaldıqlarını bildiriblər.

Sonra tədbir Heydər Əliyev məktəbinin lektoriyasında davam edib. Ümid Mirzəyev, Sahib Məmmədov, Nadir İsrafilov, Kamran Əsədov, Niyaməddin Orduxanlı, Namiq Mayılov, Zülfüqar Hüseynzadə, Vaqif Əliyev, Əhməd Abbasbəyli və başqaları çıxış edərək bütövlükdə ADPU-da aparılan islahatları, yenilikləri təqdir etdiklərini, eləcə də imtahan sessiyasının qanun çərçivəsində, şəffaf və ədalətli keçirildiyini vurğulayaraq universitetin rəhbərliyinə və tələbə-gənclərə uğurlar arzulayıblar. Çıxış edənlər bildiriblər ki, ADPU-nun pedaqoji və elmi-pedaqoji kadr hazırlığı sahəsindəki fəaliyyətə təqdirəlayiqdir və onlar bu fəaliyyətə dəstək verməyə hazırdırlar.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov İctimai Şuranın üzvlərinə monitorinqdə iştirak etdiklərinə görə təşəkkür edib və uğurlar arzulayıb. Rektor qeyd edib ki, Azərbaycan dünyanın ümumi inkişaf prosesinə qoşulub. Təhsil ümummilli, ümumxalq məsələsidir. Təhsil sahəsində dəyərlər, bilik və bacarıqlar önə keçməlidir. Ölkə rəhbərliyi bizim qarşımızda mühüm vəzifələr qoyub. Bizim əsas vəzifəmiz yüksək səviyyəli pedaqoji kadrlar hazırlamaqdır. ADPU-da sağlam və ədalətli rəqabət mühitinin yaradılması, infrastrukturun yenilənməsi, insan resurslarının inkişaf etdirilməsi istiqamətində ciddi islahatlar həyata keçirilir. Bu islahatların əsas məqsədi təhsilin keyfiyyətinin yüksəldilməsidir. ADPU-da fəaliyyət göstərən İctimai Şuranın üzvləri cəmiyyətin düşüncəsinə və ictimai rəyə təsir edə bilən şəxslərdir. Müasir dünyada ictimai rəy xüsusi önəm kəsb edən amildir. Biz sizinlə təhsil sahəsi ilə bağlı səmərəli müzakirələr aparmaq və daha geniş miqyasda əməkdaşlıq etmək niyyətindəyik.

**Orxan Abdullayev**

# Təmənnaya üsyan!

Bir tələbə yazıbdır mətbuatda:
«Təmənnaya üsyan edək həyatda».
Tələbədən doşab almaq qərəzi,
Yaxud sifariş eyləmək çərəzi,
Diqqət eylə, qoyma qanə keçməsin
Yağ ilə ət heç qazanə düşməsin.
Müəllimlik adıma vuran ləkə,
Virus olub din-imanə keçməsin.
Antipoda qəti olsun sözümüz,
Vur əlindən, heç vaxt əlin əsməsin!
«Əzrayıla işin düşsə, düzələr,
Təki işin o insanə düşməsin!»
Eləsinə yazıq demə həyatda,
Ürəyin yanmasın, qəlbin şişməsin!
Uzaq gəzib, kənar dolan həmişə,
Çalış işin o şeytana düşməsin!
Əzrayıl ona baxanda mələkdir,
Leş axtaran çalağana düşməsin!
Görəşən tək uzun qolları da var,
Sınsın, güzarı bu yanə düşməsin!
Nəffat qorxusu var ciyərlərində,
Civə ağırlığı əməllərində,
Sülənir Bakının küçələrində,
İlan kimi qıvrılıb sürünməsin!
Kim barədə deyilmişdi bu sözlər,
Tələbələr onu söyləyir əzbər?
"Əzrayıla işin düşsə düzələr,
İşin bu cür müsəlmana düşməsin!"

**Vaqif Qurbanov,**
**Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının dosenti**

# 20 Yanvar-tariximizin faciə və qəhrəmanlıq səhifəsi

Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri Ramiz Mehdiyevin müvafiq sərəncamı ilə ölkəmizdə “20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünün keçirilməsi ilə bağlı tədbirlər planı” təsdiq edilmişdir. Həmin sərəncamda respublikamızın şəhər və rayonlarında, idarə və təşkilatlarda 20 Yanvar hadisələrinin mahiyyətini əks etdirən konfrans, toplantı və mühazirələrin təşkil edilməsi, 20 Yanvar gününün Azərbaycanın suverenliyi, istiqlaliyyəti və ərazi bütövlüyü uğrunda mübarizə rəmzi kimi qeyd olunması ilə bağlı tədbirlərin keçirilməsi, mədəniyyət ocaqlarında faciəyə həsr olunmuş tamaşaların, bədii və sənədli filmlərin nümayiş etdirilməsi nəzərdə tutulur. Həmçinin dünya ictimaiyyətinin diqqətini bu faciəyə yönəltmək məqsədilə Azərbaycanın xarici ölkələrdəki diplomatik nümayəndəlikləri və icmaları vasitəsilə müvafiq tədbirlərin keçirilməsi, dünyanın aparıcı kütləvi informasiya vasitələrində, eləcə də televiziya kanallarında və İnternet şəbəkələrində 20 Yanvar hadisələri barədə müxtəlif dillərdə materialların hazırlanması və yayılmasının təmin olunması nəzərdə tutulmuşdur. Tədbirlər planına əsasən, respublikamızın bütün tədris müəssisələrində faciəyə həsr edilmiş xüsusi dərslərin keçirilməsi nəzərdə tutulur. Eyni zamanda sərəncamda 20 Yanvar hadisələri zamanı şəhid olanların ailələrinə humanitar yardımların göstərilməsi, Şəhidlər Xiyabanı ərazisində lazımi işlərin aparılması və faciə qurbanlarının xatirəsinə həsr olunan dini mərasimlərin təşkil edilməsi öz əksini tapıb.



Qeyd olunanlarla yanaşı, paytaxt ictimaiyyətinin yanvarın 20-də Şəhidlər Xiyabanına ziyarəti təşkil ediləcək, saat 12:00-da bütün ölkə ərazisində şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad ediləcək, respublikamızın şəhər və rayonlarında, kənd və qəsəbələrində hüzn əlaməti olaraq dövlət bayraqları endiriləcəkdir.

Təhsil Nazirliyi tərəfindən 20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünün keçirilməsi barədə müvafiq əmr imzalanmışdır. Həmin əmrə əsasən 20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünün keçirilməsi ilə əlaqədar Təhsil Nazirliyinin tədbirlər planı təsdiqlənmişdir. Yuxarıda qeyd edilən sənədlərə əsasən Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) də 20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünün qeyd edilməsi barədə əmr imzalanıb və bu əmr əsasında tədbirlər planı müəyyən edilib.

Qədirbilən xalqımız 20 Yanvar şəhidlərinin xatirəsini həmişə əziz tutur. Çünki onlar Azərbaycanın yenidən öz dövlət müstəqilliyini bərpa etməsində böyük rol oynayıblar. Azərbaycanın yenidən müstəqillik qazanmasında xalqımızın qəhrəman oğullarının əvəzsiz xidmətləri olmuşdur. 20 Yanvar hadisələri xalqımızın 1988-ci ildə başlanan milli-azadlıq hərəkatının kulminasiya nöqtəsi idi. Xalqımış haqlı olaraq 20 Yanvar hadisələrini həm faciə, həm də qəhrəmanlıq kimi səciyyələndirir. Çünki 20 Yanvar hadisələri xalqımızın azadlığa qovuşmasında mühüm rol oynamışdır.

1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə keçmiş Sovet Ordusunun ən müasir döyüş texnikası ilə silahlanmış hissələri Bakıda çox dəhşətli və qanlı bir cinayət törətdilər. Öz hüquqlarının bərpası üçün küçə və meydanlara toplaşmış dinc mülki əhaliyə odlu silahlardan atəş açıldı, xalq güllələbaran edildi. Xüsusi təlim keçmiş əsgərlər, hətta qoca və uşaqlara belə rəhm etmirdilər. Nəticədə, həmin gecə 134 nəfər (bəzi mənbələrdə bu rəqəm 170 nəfər göstərilir) soydaşımız amansızcasına qətlə yetirildi, 700-dən çox adam yaralandı, 321 nəfər itkin düşdü, yüzlərlə insan həbs edildi. Sovet Ordusunun xüsusi təlim keçmiş hissələrinin Azərbaycanda törətdiyi cinayətlər yalnız Bakıda baş vermiş faciə ilə kifayətlənmədi. Yanvarın 25-də və 26-da Neftçala və Lənkəranda bir sıra cəza tədbirləri həyata keçirildi və insanlar amansızlıqla qətlə yetirildilər. Azərbaycan informasiya blokadasına salınmışdı. Dünya ictimaiyyəti Azərbaycanda baş vermiş bu qanlı və məşum hadisədən xəbərsiz idi. Xalqımızın vətənpərvər oğlu, ulu öndərimiz Heydər Əliyev yanvarın 21-də Azərbaycanın Moskvadakı Nümayəndəliyinə gələrək Sovet Ordusunun Bakıda törətdiyi bu qanlı cinayəti kəskin pisləyən bəyanat verdi və faciənin bütün günahkarlarının cəzalandırılmasını tələb etdi.

Qeyd edək ki, 20 Yanvar faciəsinə siyasi-hüquqi qiymət ümummilli liderimiz Heydər Əliyevin Azərbaycanda xalqın inadlı tələbi ilə yenidən respublika rəhbərliyinə qayıtmasından sonra verildi. 1994-cü il yanvarın 5-də Ümummilli Liderimiz müvafiq Sərəncam imzaladı ki, həmin Sərəncamda da faciənin respublika miqyasında geniş araşdırılıb siyasi-hüquqi qiymət verilməsi tövsiyə olunurdu. Ümummilli Liderimizin müvafiq Sərəncamı ilə 20 Yanvar ölkəmizdə Ümumxalq Hüzn Günü elan edilmişdir. Həmin gün Azərbaycanın müstəqilliyi və ərazi bütövlüyü uğrunda həlak olmuş şəhid soydaşlarımızın xatirəsi dövlət səviyyəsində böyük ehtiramla yad olunur.

Ulu öndərimiz Heydər Əliyev tərəfindən əsası qoyulmuş müdrik siyasi kursu uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 20 Yanvar şəhidlərinin və bütövlükdə bu qəbildən olan şəxslərin ailələrinə dövlət səviyyəsində qayğı və köməkliyin göstərilməsi və onların sosial müdafiəsinin gücləndirilməsi üçün bütün lazımi tədbirləri həyata keçirir. Öz milli dövlətçiliyini yenidən bərpa etmiş respublikamızın bütün bölgələrində şəhidlərin xatirəsinə abidə-komplekslər ucaldılmışdır. Azərbaycan Respublikasının Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva 20 Yanvar faciəsinin qurbanlarına və onların ailələrinə xüsusi diqqət və qayğı göstərir.

20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümü ilə əlaqədar olaraq yanvar ayının 10-dan başlayaraq ADPU-da azadlıq uğrunda həlak olmuş şəhidlərin xatirəsinə həsr edilmiş müxtəlif tədbirlər keçirilib. Yanvarın 19-da universitetin rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi Şəhidlər Xiyabanını ziyarət edib, Azərbaycanın müstəqilliyi və ərazi bütövlüyü uğrunda həlak olmuş şəhid soydaşlarımızın məzarlarına gül qoyaraq xatirələrinə ehtiramlarını ifadə ediblər.

20 Yanvar elə bir tarixdir ki, illər, əsrlər ötsə də, bu gün heç vaxt unudulmayacaq, yaddaşlardan silinməyəcəkdir. Xalqımıza qarşı bu bəşəri cinayəti törədənlər isə həmişə lənətlənəcəklər.

**“Gənc müəllim”**

# İbtidai təhsil fakültəsində 20 Yanvar faciəsinə həsr olunmuş tədbir

**Yanvarın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsində 20 Yanvar faciəsinə həsr olunmuş tədbir keçirilib . Tədbirdə fakültənin İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının, Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının professor-müəllim heyəti, dekanlığın əməkdaşları, tyutorlar və qiyabi şöbənin tələbələri iştirak ediblər.**

Tədbirdə fakültənin dekanı, professor Fərrux Rüstəmov çıxış edərək Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri Ramiz Mehdiyevin müvafiq sərəncamı ilə təsdiq edilən “20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünün keçirilməsi ilə bağlı tədbirlər planı”na uyğun olaraq ADPU-nun rektoru, professor Cəfər Cəfərovun “20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünün qeyd edilməsi barədə” imzaladığı əmrlə və tədbirlər planı ilə tədbir iştirakçılarını tanış edib. Professor F.Rüstəmov XX əsrin 80-cı illərinin sonu, 90-cı illərin əvvəllərində Azərbaycanda baş verən ictimai-siyasi hadisələr haqqında geniş məlumat verib. Azərbaycanda baş verən milli-azadlıq hərəkatını boğmaq məqsədilə SSRİ rəhbərliyinin xalqımıza qarşı törətdiyi cinayətlərdən danışıb. Bununla yanaşı o, 20 Yanvarı faciə günündən daha çox şərəf tarixi, qəhrəmanlıq tarixi kimi yad etməyin vacibliyini bildirib. Çıxışında vurğulayıb ki, yalın əllə düşmən tanklarının qarşısını kəsənlər gülləyə tuş gəlsə də, qan su yerinə axıdılsa da, SSRİ rəhbərliyi bu millətin əzmini qıra bilmədi.Ulu öndər Heydər Əliyev zamanında millətin harayına çatdı, özünü və övladının həyatını təhlükəyə ataraq haqq səsini qaldırdı, cinayətkarları ifşa etdi. Yalnız Ulu Öndər Azərbaycanda yenidən siyasi hakimiyyətə gələndən sonra 20 Yanvar faciəsinə siyasi-hüquqi qiymət verildi, 20 Yanvar ölkəmizdə Ümumxalq Hüzn Günü elan edildi. Hər il həmin gün Azərbaycanın müstəqilliyi və ərazi bütövlüyü uğrunda həlak olmuş şəhid soydaşlarımızın xatirəsi dövlət səviyyəsində böyük ehtiramla yad olunur.



Tədbirin sonunda fakültənin professor-müəllim heyətinin tələbələrlə bu barədə geniş söhbət aparmaları, mühazirələr oxumağı tövsiyə olundu.



# Novosibirsk Dövlət Universitetinin professoru ADPU-da

**Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 9 aprel 2018-ci il tarixli Sərəncamı ilə 27 mart Azərbaycanda "Elm günü" təsis edilib. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Elm günü" münasibətilə bir sıra tədbirlərin keçirilməsi planlaşdırılıb. İlk tədbir 23 yanvar 2019-cu il tarixdə Novosibirsk Dövlət Universitetinin professoru, Rusiya Elmlər Akademiyasının Sibir Bölməsinin Sobolev adına Riyaziyyat İnstitutunun aparıcı elmi işçisi, fizika-riyaziyyat elmləri doktoru İvan Anatolyeviç Maltsevin ADPU-da məruzəsi ilə başlandı. Qeyd etmək yerinə düşər ki, professor İ.A.Maltsev ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, fizika-riyaziyyat elmləri doktoru, professor Asəf Zamanovun dəvəti ilə Azərbaycana səfər edib.**





ADPU-nun Heydər Əliyev məktəbinin lektoriyasında təşkil edilən elmi seminarı professor Asəf Zamanov açaraq, professor İ.A.Maltsevin - SSRİ Elmlər Akademiyasının həqiqi üzvü, SSRİ Elmlər Akademiyasının Sibir Bölməsinin yaradıcılarından biri, Sibir cəbr və məntiq elmi məktəbinin yaradıcısı, fizika-riyaziyyat elmləri doktoru, professor Anatoli İvanoviç Maltsevin oğlunun elm və təhsil sahəsindəki əsas uğurları barədə məlumat verdi və Azərbaycanda yüksəkixtisaslı elmi kadrların formalaşmasında Maltsevlərin xidmətlərini xüsusilə vurğulayaraq dəvəti qəbul etdiyi üçün tanınmış alimə təşəkkürünü bildirdi. ADPU-nun son illərdəki elmi uğurları və Novosibirsk Dövlət Universiteti ilə gələcək əməkdaşlığının hər iki tərəf üçün vacibliyi qeyd edildi.

Professor İ.A.Maltsev cəbr və məntiq sahəsində SSRİ Elmlər Akademiyasının Sibir Bölməsində, həmçinin Novosibirsk Dövlət Universitetində aparılan elmi-tədqiqat işləri və öz elmi nəticələri barədə geniş məruzə etdi. Azərbaycanın son illərdə hərtərəfli inkişafından, həmçinin ADPU ilə əməkdaşlıqdan məmnunluğunu bildirdi, dəvət üçün universitetin rəhbərliyinə təşəkkür etdi. Qonaq həmçinin ADPU-nun alimlərinin riyaziyyat sahəsindəki uğurları barədə də məlumatlandırıldı.

Elmi seminardan sonra professor İ.A.Maltsev universitetin rektoru, tarix üzrə elmlər doktoru, professor Cəfər Cəfərovla görüşdü. Rusiya və Azərbaycan universitetlərinin gələcək əməkdaşlığının perspektivləri barədə fikir mübadiləsi aparıldı. Rektor 75 illik yubileyi münasibətilə rusiyalı alimi təbrik etdi.

Bu səfər çərçivəsində professor İ.A.Maltsevin AMEA-nın Riyaziyyat və Mexanika İnstitutunda, Bakı Dövlət Universitetində, Gəncə Dövlət Universitetində də məruzələri nəzərdə tutulub.

# "Təhsildə İKT və innovativ sahibkarlığın təşviqi" mövzusunda dəyirmi masa

**Yanvarın 24-də İnformasiya Texnologiyalarının İnkişafı Dövlət Fondunun və Azərbaycan Dövlət Pedaqoji Universitetinin təşəbbüsü, Nəqliyyat, Rabitə və Yüksək Texnologiyalar Nazirliyinin və Təhsil Nazirliyinin dəstəyi ilə "Təhsildə İKT və innovativ sahibkarlığın təşviqi" mövzusunda dəyirmi masa keçirilib. Dəyirmi masada informasiya-kommunikasiya texnologiyaları (İKT) üzrə biliklərin tədrisdəki problemləri və təhsilin innovativ sahibkarlığın inkişafında rolu barədə müzakirələr aparılıb.**






Tədbirdə çıxış edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov bildirib ki, Azərbaycanda bütün sahələrdə, o cümlədən təhsildə müasir dövrün tələblərinə uyğun yeniləşmə prosesi gedir. Bu yeniləşmə prosesində İKT vacib bir xətdir. Azərbaycan dövləti İKT-nin cəmiyyət həyatına daha səmərəli inteqrasiyası üçün vacib dövlət proqramlarını icra edir. Ölkəmiz bu sahədə uğurları ilə seçilən ölkələr kateqoriyasına daxil olub. Lakin bu sahədə görüləcək işlər də çoxdur. Xüsusən, pedaqoji kadrlar hazırlayan ali təhsil müəssisəsi olaraq Azərbaycan Dövlət Pedaqoji Universiteti hazırladığı kadrların İKT üzrə maarifləndirilməsində, öyrənmə prosesində İKT-nin rolunu dərk edərək öz fəaliyyətini buna uyğun qurmağa çalışır. Müasir



müəllim profilində peşəkar informasiya-kommunikasiya texnologiyalarının istifadəçisi keyfiyyətinin olması bizim üçün əhəmiyyətli məsələyə çevrilib. Hazırlanan müəllim kadrlarının öz fənninin tədrisində İKT bacarıqlarından ustalıqla istifadə etməsi artıq zərurətə çevrilib.

2019-cu ilin təhsildə tədris planlarının yeniləşməsi ili olduğunu xatırladan rektor bildirib ki, rəhbərlik etdiyi ali təhsil müəssisəsində 20-dən çox ixtisas üzrə bu proses başlayıb. Bir çox ixtisaslar üzrə isə əhəmiyyətli irəliləyişə nail olunub. Ali təhsil müəssisələri gənclərdə bilikləri əldə etmək vərdişini formalaşdırmalıdır. Bununla da onlar gələcəkdə qarşılarına çıxacaq yeni ixtisaslar, peşələr barədə informasiya əldə edə, özlərini cəmiyyətin ehtiyaclarına uyğun təkmilləşdirə bilərlər. Bu



vərdişlər arasında ən zəruri olanı da rəqəmsal bacarıqlar və xarici dil bilikləridir. Buna görə də yeniləşmə prosesinə məhz bu iki sahənin inkişaf etdirilməsi üçün zəruri saydığımız tədbirlərdən başlamışıq.

Dəyirmi masada Nəqliyyat, rabitə və yüksək texnologiyalar nazirinin müavini Elmir Vəlizadə informasiya-kommunikasiya texnologiyaları sahəsində innovativ sahibkarlıq fəaliyyətinin inkişafı istiqamətində ali təhsil müəssisələri ilə birlikdə maarifləndirici tədbirlərin keçirilməsinə xüsusi diqqət yetirildiyini bildirib.

Nazir müavini qeyd edib ki, nazirliyin İnformasiya Texnologiyalarının İnkişafı Dövlət Fondunun dəstəyi ilə ali məktəblərdə yaradılan biznes inkubatorların və mərkəzlərin əsas məqsədi



gənclərin İKT sahəsinə marağını artırmaq, bu sahədə kütləviliyi təmin etmək, həmçinin gənc sahibkarların innovativ ideyalarının biznesə çevrilməsinə dəstək verməkdən ibarətdir.

Təhsil nazirinin müavini Məhəbbət Vəliyeva son illər təhsil sisteminin informasiyalaşdırılması istiqamətində əsaslı işlərin görüldüyünü qeyd edib. Nazir müavini ölkə başçısının müvafiq sərəncamları ilə təhsilin informativ hüquqi bazasının təkmilləşdirildiyini, mobil təminatın hazırlandığını, təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyalarının tətbiqinin əhəmiyyətli dərəcədə genişləndirildiyini bildirib. O, informasiya cəmiyyəti inkişaf etdikcə İKT-nin təhsildə tətbiqinin vacib məsələlərdən birinə çevrildiyini vurğulayıb.

Tədbirdə müxtəlif ali təhsil müəssisələrinin əməkdaşları, İKT və təhsil sahəsi üzrə ekspertlər, o cümlədən İKT şirkətlərinin, müvafiq dövlət qurumlarının nümayəndələri təmsil olunublar. Ali məktəblərdə informatika fənni üzrə tədris planlarının keyfiyyətinin artırılması, təhsil müəssisələrinin informasiya-kommunikasiya üzrə maddi-texniki bazasının təkmilləşdirilməsi, təhsil sahəsinin informasiyalaşdırılması, təhsildə innovativ sahibkarlığın təbliğ olunması və digər mövzular ətrafında çıxışlar olub.

Ali təhsil müəssisələrinin təhsil-tədqiqat-innovasiya mərkəzlərinə çevrilməsi, rəqabətqabiliyyətli mütəxəssis hazırlığının təmin olunması, xüsusən də, mühəndislik və digər texnoloji ixtisaslara həvəsin artırılması, nəzəri və praktiki biliklərə yiyələnən, müasir təfəkkürlü və rəqabətqabiliyyətli kadrların hazırlanması, qabaqcıl texnologiyaların və idarəetmə üsullarının, elmi nailiyyətlər əsasında innovasiyaların yaradılması istiqamətində görülən işlər qeyd olunub.

# ADPU-nun komandası futzal yarışında iştirak edib

Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Komitəsinin (ATİAHİK) təşkilatçılığı ilə respublikamızın ali məktəb tələbələrinin futzal yarışı keçirilib. “A” qrupunda Azərbaycan Dövlət





Pedaqoji Universiteti (ADPU), Bakı Slavyan Universiteti (BSU), Azərbaycan Dillər Universiteti (ADU), Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC), Sumqayıt Dövlət Universiteti (SDU) və Bakı Ali Neft Məktəbi (BANM) yer alıb. Qrup yarışlarından sonra Bakı Dövlət Universitetinin (BDU) və Azərbaycan Texniki Universitetinin (AzTU) komandalarını məğlub edən komandamız finala vəsiqə qazanıb.

Qeyd edək ki, ADPU-nun komandası 21 ali təhsil müəssisəsinin komandasının iştirak etdiyi yarışda II yeri tutub.

Yanvarın 25-də ADPU-nun rektoru, professor Cəfər Cəfərov bu münasibətlə komandanın üzvləri ilə görüşüb. Görüşdə Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vurğun Məmmədov, İdman klubunun müdiri Araz Xəlilov, rektor köməkçisi Riyad Rüstəmli iştirak ediblər. Görüşdə rektor komanda üzvlərini təbrik edib, onlara təhsildə və gələcək yarışlarda uğurlar arzulayıb.

Biz də bu münasibətlə komandamızı təbrik edir və yeni uğurlar arzulayırıq.

# ADPU-ya yeni qəbul olunmuş doktorant və dissertantlarla görüş

Yanvarın 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2018-ci il üçün fəlsəfə doktoru proqramı üzrə doktoranturaya və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbul olunmuş şəxslərlə görüş keçirilib. TÜRKSOY kafedrasında keçirilən görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov iştirak ediblər.

Rektor Cəfər Cəfərov yeni qəbul olunmuş doktorant və dissertantları təbrik edib, onlara gələcək elmi fəaliyyətlərində uğurlar arzulayıb. Rektor qeyd edib ki, ADPU-da yeniliklər, islahatlar, innovativ layihələr uğurla həyata keçirilir. Bu islahatlar bütövlükdə ölkəmizdə gedən yeniləşmə, müasirləşmə prosesinin tərkib hissəsidir. Təhsil xalqın, millətin gələcəyi üçün həlledici əhəmiyyət kəsb edən sahədir. Təhsil ölkəmizin milli təhlükəsizlik məsələsidir.Təhsil sahəsində insan resursları böyük rol oynayır. Ölkə rəhbərliyi bizim qarşımıza mühüm vəzifələr qoyub. Bu vəzifələrin uğurla həyata keçirilməsində doktorantların və dissertantların qəbulu xüsusi əhəmiyyət kəsb edir. ADPU-nun göstəriciləri sağlam və ədalətli rəqabət mühiti şəraitində ildən-ilə yaxşılaşır. Əsas hədəfimiz ADPU-nun regionun ən güclü universitetlərindən birinə çevrilməsidir. Siz daim öz üzərinizdə ciddi işləməli, əzmlə çalışmalı, Azərbaycanın ümumi inkişaf prosesinə öz töhfələrinizi verməlisiniz.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxış edərək bildirib ki, fəlsəfə doktoru proqramı üzrə doktoranturaya və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbul uğurla başa çatıb. Qəbulun nəticələri barədə məlumat verən professor A.Zamanov qeyd edib ki, Təhsil Nazirliyinin 30 noyabr 2018-ci il tarixli 03-11-



1878/15 nömrəli məktubuna əsasən fəlsəfə doktoru proqramı üzrə doktoranturaya və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbulla bağlı “Azərbaycan”qəzetinin 4 dekabr 2018-ci il tarixli 273-cü nömrəsində elan dərc edilib, 25 dekabr 2018-ci il tarixə qədər sənəd qəbulu aparılıb. Planda nəzərdə tutulmuş ixtisaslar üzrə 46 nəfərin sənədi- fəlsəfə doktoru proqramı üzrə dokto□ran□turaya 33 sənəd, dissertanturaya 8 sənəd, elmlər doktoru proqramı üzrə dissertanturaya 5 sənəd qəbul edilib. Fəlsəfə doktoru proqramı üzrə dissertan□turaya sənəd təqdim etmiş 1 nəfər sənədlərini geri götürüb.

ADPU rektorunun 6 dekabr 2018-ci il tarixli 3/173 nömrəli əmrinə əsasən yaradılmış Sənəd Qəbulu Komissiyasının 28 dekabr 2018-ci il tarixli iclasının qərarına əsasən 45 nəfər qəbul imtahanlarına və müsahibələrə buraxılıb.

Rektorun 24 dekabr 2018-ci il tarixli 3/178 nömrəli əmrinə əsasən yaradılmış müvafiq komissiyalar tərəfindən 7-24 yanvar 2019-cu il tarixlərdə imtahanlar və müsahibələr aparılıb. İmtahanların və müsahibələrin nəticələri əsasında 10 nəfər fəlsəfə doktoru proqramı üzrə dokto□ran□turaya, 5 nəfər fəlsəfə doktoru proqramı üzrə dissertanturaya, 1 nəfər elmlər doktoru proqramı üzrə dissertanturaya qəbul olunub.

Professor A.Zamanov çıxışının sonunda yeni qəbul olunmuş doktorant və dissertantların özlərini doğruldacaqlarına inamını ifadə edib və onlara uğurlar arzulayıb.

Doktorant və dissertantlar çıxış edərək qəbul prosesinin düzgün, ədalətli və şəffaf keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər.

Sonda vəsiqələr verilib, xatirə şəkli çəkdirilib.

# Şair qəlbli müəllim

**“Çox olub o kəslər ki, səhəri axşama çatdırmaq niyyətləri olub, lakin çatdıra bilməyiblər, çox olub o kəslər ki, sabaha yetişmək ümidləri olub, lakin yetişməyiblər”. Bəşir müəllim ümidləri, niyyətləri, arzuları ilə sabahları açdı, lakin bir sabah ona qaranlıq oldu.**

22 yanvar 2019-cu ildə qəfil gələn xəbər Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının əməkdaşlarını dərindən kədərləndirdi. Kafedranın sevimlisi Bəşir müəllimin təkrarsız, nikbinliklə dolu həzin səsi həmişəlik susdu. Sıramızdan parlaq bir ulduz qopub ayrıldı, söndü. Bəşir müəllim onu tanıyanların ürəyində xoş izlər, xatirələr buraxıb əbədiyyətə qovuşdu.

Bəşir müəllim ömür yolunu özü istədiyi kimi mənalı yaşadı. O, gəlimli - gedimli dünyada həyatın mənasını belə ifadə edirdi:

*Müdriklər demişdir dünya tamaşa,*
*Verilən ömürdə özünü yaşa.*
*Zirvənə çatarkən canında qorxu,*
*Sonunu gözlərkən düşmə təlaşa.*

Bu misralardan göründüyü kimi, Bəşir müəllim heç kimi təkrar etmədən ömür yolunu qürurla yaşadı. Geridə cəmiyyətimiz üçün övladlarından, yetirdiyi kadrlardan, ədəbi yaradıcılığından ibarət bir zəngin irs qoydu.

Bəşir Şükür oğlu Quliyev bərəkətli Cəlilabad torpağında, öz atasının adını daşıyan Şükürlü kəndində anadan olmuşdur. Yeri gəlmişkən, Milli Məclisin 6 may 1997-ci il tarixli qanunu və ulu öndər Heydər Əliye-



vin imzası ilə Azərbaycan dövləti qarşısında xidmətlərinə və İkinci Dünya müharibəsində qəhrəmanlığına görə atası Şükür kişinin adı ilə yaşayış məntəqəsinin adı dəyişilib Şükürlü adlanmışdır.

Bakı Dövlət Universitetini bitirdikdən sonra Bəşir müəllim ömrünün 50 ilindən çoxunu Azərbaycan Dövlət Pedaqoji Universitetində yüksəkixtisaslı pedaqoji kadrların hazırlanmasına sərf etmişdir. Geniş tarixi biliyə, yüksək mühazirəçilik qabiliyyətinə malik olmuş, mənimsənilmiş biliyi obyektiv, ədalətli qiymətləndirməsi, nəzakətli davranışı tələbələrdə ona rəğbət oyatmışdır.

Bəşir müəllim Pedaqoji Universitetin və respublikamızın ictimai-siyasi həyatında fəal iştirak edirdi. O, məclislərin bəzəyi idi, kollektivimizin keçirdiyi məclislərə ağsaqqallıq edir, şeirləri, lətifələri, məlumatları ilə tədbirlərə şirinlik, xoş əhvali - ruhiyyə qatırdı. Bəşir müəllim kollektivdə mehribanlıq yaradır, lazım gələndə hər cür dəstək verirdi. Azərbaycan ictimaiyyəti Bəşir müəllimi kamil ziyalı kimi tanıyırdı. O, Azərbaycan adını uca tutur, səyahət etdiyi ölkələrdə xalqımızı ləyaqətlə təmsil edirdi.

Bəşir müəllim poeziya vurğunu idi. Dünyaya, Vətənə, cəmiyyətə, xeyirə - şərə, sevgiyə və s. münasibətini poetik dillə ifadə edirdi. Şair qəlbli müəllimin qələmindən çıxan şeirlər “Təzadlı dünya”, “Hikmət çələngi” kitablarında toplanmışdır. Onun fikrincə, şeir “arzudan doğan insan sevinci, insan nisgili, qəlb ağrısı, aşiqlərin odlu baxışı, xalı naxışı, ana laylası, Xocalı yarası, Qarabağ həsrətli şikəstə səsi... Araz yarası, Xəzərin tufan qəzəbi” dir. Şair insanları düşünməyə vadar edir:

*İnsan! Dünyanın bir anı*
*Ancaq yaşadır özündə dünyanı*
*...Dünya, deyə-gülə insan*
*ömrünü yeyir.*
*Qaytarır özünü-özünə*
*İnsanlar dünyanı dərk etsə əgər,*
*Bəşərin dərdini içindən çəkər.*
*Müqəddəs hisslərlə*
*hakim kəsilib,*
*Bir körpə güldürüb, bir çiçək əkər.*

Bəşir müəllimin doğmalarının kədəri bizim kollektivin də kədəridir. Əzizimiz Bəşir müəllimə Allahdan rəhmət diləyirik!

**Naibə Əhmədova,**
**Azərbaycan tarixi kafedrasının müdiri, dosent**
**Zakir Kərimov,**
**dosent**

# SABAH qrupları tələbələrinin “Sağlam təhsil” siniflərinin pedaqoji təcrübəsinin başlanması ilə bağlı görüş



Yanvarın 30-da SABAH qrupları tələbələrinin “Sağlam təhsil” siniflərinin pedaqoji təcrübənin başlanması ilə bağlı görüş keçirilib. Görüşdə ilk çıxışı Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) SABAH qrupları üzrə rəhbəri Lalə Mürsəlbəyova edib. L.Mürsəlbəyova öz çıxışında SABAH qruplarının “Sağlam təhsil” siniflərini pedaqoji təcrübəsi haqqında fikirlərini bölüşüb və bu təcrübənin tələbələr üçün əhəmiyyətindən bəhs edib.

Sonra çıxış üçün söz SABAH qrupları İcra Komitəsinin Tələbələrlə iş üzrə meneceri İlduzə Qəhrəmanzadəyə verilib. İ.Qəhrəmanzadə pedaqoji təcrübədə iştirak edəcək tələbələri onlara təcrübədə rəhbərlik edəcək müəllimlər ilə tanış edib. Daha sonra təcrübə dövründə işləniləcək tədqiqat mövzuları tələbələrə paylanılıb.

Görüşdə növbəti çıxış “Sağlam təhsil-sağlam millət” layihəsinin rəhbəri Vüsal Qasımova verilib. V.Qasımov hazırda 39 məktəbdə tətbiq olunan “Sağlam təhsil” siniflərinin əhəmiyyəti barədə söz açıb.

Sonda tələbələr tərəfindən verilən suallar müəllim və rəhbərlik tərəfindən cavablandırılıb.

# Elmi Şuranın iclası

**Yanvarın 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının 2019-cu il üçün ilk iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq bildirib ki, iclasın gündəliyinə "ADPU-nun 2018-ci il üçün elmi və elmi-təşkilati fəaliyyəti haqqında" hesabat və cari məsələlər daxildir.**

Rektor Cəfər Cəfərov giriş sözündə bildirib ki, hazırda ADPU-da 2018-2019-cu tədris ilinin payız semestrinin imtahan sessiyası davam edir. İmtahan sessiyası mütəşəkkil, şəffaf və obyektiv keçirilir. Həmçinin Filologiya fakültəsinin 5 kafedrasının müdiri vəzifəsinə seçkinin keçirilməsi nəzərdə tutulur. Biz seçki prosesində şəffaflığı və obyektivliyi təmin etməklə yanaşı, yüksək səviyyəli mütəxəssislərə üstünlük veririk. Universitetdə bütün ixtisaslar üzrə tədris planlarının müzakirəsi keçirilməlidir. Tədris planlarının hazırlanması zamanı qabaqcıl beynəlxalq təcrübəni mütləq tətbiq etməliyik. Son vaxtlar ölkəmizdə idarəetmənin optimallaşdırılması üçün ciddi addımlar atılır, yeni dövrün tələblərinə uyğun idarəetmə sistemi formalaşdırılır. ADPU buna uyğun olaraq işin yenidən daha yaxşı qurulmasına xüsusi diqqət yetirməlidir. Universitetimiz bütün elmi və intellektual potensialı ilə cəmiyyətdə baş verən müsbət proseslərə dəstək verməlidir.



"ADPU-nun 2018-ci il üçün elmi və elmi-təşkilati fəaliyyəti haqqında" hesabat məruzəsi ilə Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxış edib. Professor A.Zamanov bildirib ki, son illər inkişaf etmiş dünya dövlətlərində elm və təhsilin bir-biri ilə əlaqələndirilməsinə və hər iki sahənin innovasiyaların tətbiqi yolu ilə paralel şəkildə inkişaf etdirilməsinə xüsusi diqqət verilir. Strateji hədəf insan resurslarının inkişaf etdirilməsidir. ADPU-da elmi potensialın yüksəldilməsi və elmi-pedaqoji kadrların hazırlanması sahəsində məqsədyönlü tədbirlər həyata keçirilir. Elmi-tədqiqat işlərinin planlaşdırılması və yerinə yetirilməsi üzrə ADPU-nun müvafiq kafedra və elmi-tədqiqat laboratoriyalarında (ETL) 2018-ci il üçün planlaşdırılmış işlər yerinə yetirilmişdir. Elmi-tədqiqat və təcrübə-kostruktor işlərinin yerinə yetirilməsi və tətbiqi ilə bağlı tamamlanmış işlərdən 164-ü tədrisə tətbiq olunub. ADPU elmi layihələrdə fəal iştirak etmək üçün səmərəli fəaliyyət göstərir. 2018-ci ildə universitetimiz Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun elan etdiyi "Elm-təhsilin inteqrasiyası" müsabiqəsində 5 layihə qazanıb. ADPU-da son 3 il ərzində Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının dissertasiyaların əsas nəticələrinin dərc olunması tövsiyə edilən dövri elmi nəşrlərin siyahısına daxil edilmiş 6 dövri elmi jurnal nəşr olunur. Bu jurnallarda universitet mütəxəssisləri ilə yanaşı, respublikamızın, eləcə də xarici ölkə alimlərinin məqalələri dərc olunur. ADPU-nun alimləri impakt-faktor göstəricili dövri elmi jurnalların redaksiya heyətində təmsil olunurlar. Universitetdə planlaşdırılan və yerinə yetirilməsi vacib hesab edilən elmi-tədqiqat işləri müzakirədən keçərək 2018-ci il üçün təsdiqlənən planın tərkib hissəsi kimi öz əksini tapıb. ADPU-nun fəaliyyət planına uyğun olaraq 3 beynəlxalq, 10 respublika səviyyəli elmi konfrans keçirilib. Professor-müəllim heyəti ilə yanaşı, tələbələrin elmi fəaliyyətə cəlb edilməsinə də xüsusi diqqət yetirilir. Hər il, o cümlədən 2018-ci ildə də Tələbə Elmi Cəmiyyətinin konfransı keçirilmiş, müsbət rəy almış işlər konfrans materialları toplusunda dərc olunmuşdur. Azərbaycan Xalq Cümhuriyyətinin 100 illik yubileyi münasibəti ilə "Fənlərin tədrisi metodikası: müasir yanaşmalar" mövzusunda magistrantların I Respublika elmi konfransı keçirilmiş, konfrans materialları çap edilmişdir. 1975-2018-ci illər ərzində ADPU alimlərinin Tomson Royters qrupuna daxil edilən dövri elmi jurnallarda çap olunmuş 303 elmi məqaləsinin 58-i (20 faizə qədəri) son 3 ilə (2016, 2017, 2018) aiddir.

ADPU-da tədris prosesinin elmi-tədqiqatla əlaqələndirilməsi, elm və təhsilin istehsalata inteqrasiyasının gücləndirilməsi, tələbə, magistrant və doktorantlarda tədqiqatçılıq və peşə fəaliyyəti üçün zəruri olan praktiki bilik, bacarıq və vərdişlərin formalaşdırılması, müxtəlif elm sahələrində elmi yeniliklərin və innovasiyaların tədris prosesinə tətbiqi, müvafiq ixtisas sahələri üzrə aparıcı mütəxəssislərin tədris prosesinə cəlb edilməsi və birgə elmi-tədqiqatların aparılması məqsədilə Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Riyaziyyat və Mexanika İnstitutu, Fizika İnstitutu, Nizami adına Ədəbiyyat İnstitutu, Nəsimi adına Dilçilik İnstitutu, Folklor İnstitutu, akademik Y.H. Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutu, akademik Ə.M.Quliyev adına Aşqarlar Kimyası İnstitutu, Kataliz və Qeyri-üzvi Kimya İnstitutu, akademik Həsən Əliyev adına Coğrafiya İnstitutu, Torpaqşünaslıq və Aqrokimya İnstitutu, A.A.Bakıxanov adına Tarix İnstitutu, Arxeologiya və Etnoqrafiya İnstitutu və s. ilə əməkdaşlıq genişləndirilib.

ADPU-da yeni yaradılmış 3 auditoriyanın-akademik Yusuf Məmmədəliyev, akademik Zahid Xəlilov, akademik Həsən Abdullayev auditoriyalarının açılışında və ADPU-da bütün elm sahələri üzrə keçirilmiş olimpiadaların qaliblərinin təltifedilmə mərasimində AMEA-nın prezidenti, akademik Akif Əlizadə, Təhsil naziri Ceyhun Bayramov, Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun icraçı direktoru Elçin Babayev iştirak ediblər.

Hazırda dünyanın qabaqcıl təcrübəsinin öyrənilib tətbiq edilməsi sahəsində uğurlu nətcələr qazanılıb. ADPU 2018-ci ildə beynəlxalq tərəfdaşları ilə birgə 3 beynəlxalq elmi konfrans keçirib. 2017-ci ildə Azərbaycanda ilk dəfə olaraq ADPU-da TÜRKSOY kafedrası yaradılıb və bu kafedranın da təşkilatçılığı ilə bir sıra beynəlxalq və respublika səviyyəli elmi tədbirlər keçirilib. ADPU-nun əməkdaşları beynəlxalq konfrans və simpoziumlarda Azərbaycan elmini uğurla təmsil edirlər.

Kitabxana-İnformasiya Mərkəzinin fəaliyyətinin dövrün tələblərinə uyğun təşkili məqsədilə islahatlar həyata keçirir.

Professor A.Zamanov çıxışının sonunda ADPU-nun innovativ inkişaf, "Tədqiqat universiteti" statuslu universitetə çevrilmə, güclü elmi potensialın formalaşdırılması və bununla da Azərbaycanın inkişafına töhfə verə biləcəyi sahələrdə bundan sonra da fəaliyyətini uğurla davam etdirməsinin vacibliyi məsələlərindən söz açaraq, bu işlərin yerinə yetirilməsi məqsədilə universitetdə görüləsi işlərlə əlaqədar təkliflərini bildirib.

Professor Malik Cəbrayılov, professor Vəli Əliyev, professor Fərrux Rüstəmov, professor Müseyib İlyasov, professor Nailə Verdizadə, dosent İsrayıl İsgəndərov, dosent Məhəmməd Abduyev hesabat məruzəsini yüksək qiymətləndirərək hesabatın müsbət qiymətləndirilməsini təklif ediblər.

Elmi Şura "ADPU-nun 2018-ci il üçün elmi və elmi-təşkilati fəaliyyəti haqqında" professor A.Zamanovun hesabatını müsbət qiymətləndirib.

Cari məsələlərin müzakirəsi zamanı Elm və innovasiyalar üzrə prorektor professor A.Zamanov ADPU-da 2018-ci il üçün fəlsəfə doktoru proqramı üzrə doktoranturaya və dissertanturaya, elmlər doktoru proqramı üzrə dissertanturaya qəbulun nəticələri barədə məlumat verib, həmçinin Elm və innovasiyalar şöbəsinin, Davamlı təhsil və təlim şöbəsinin əsasnamələrinin layihələrini təqdim edib.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov ADPU-nun filialının Elmi Şurasının nümunəvi Əsasnaməsinin təsdiqi haqqında, ADPU-nun Rektoryanı Şurası haqqında Əsasnamənin təsdiq edilməsi haqqında, "ADPU-nun Fəxri doktoru", "ADPU-nun Fəxri professoru" fəxri adlarının təqdim edilməsi haqqında, ADPU-da pedaqoji təcrübənin qiymətləndirilməsi qaydalarının təkmilləşdirilməsi barədə, "ADPU-nun Şərəf kitabı"nın hazırlanması və ADPU-da auditoriyalara fəxri adların verilməsi haqqında Əsasnamə haqqında, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov Davamlı İnkişaf üzrə İnformasiya və Təlim Mərkəzinin təsis olunması barədə, Ümumi şöbənin baş mütəxəssisi Əlövsət Hümbətov isə ADPU-da Kargüzarlıq və sənədlərin saxlanması işinin təkmilləşdirilməsi haqqında məlumat veriblər.

Cari məsələlər müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

**Orxan Fəxrəddinoğlu**



***Tələbələrimiz yazırlar***

# Xalqımızın şəhid qızı

Azadlığı, müstəqilliyi, babalardan miras qalan torpağı uğrunda oğlunu, qızını şəhid verən xalq xoşbəxt xalqdır. Bu mənada Azərbaycan xalqının qürur hissi keçirməyə, başını uca tutmağa tam mənəvi haqqı var. 1990-cı ilin qanlı 20 Yanvar gecəsində, Dağlıq Qarabağ uğrunda gedən döyüşlərdə xalqımızın yüzlərcə igid övladı şəhidlik zirvəsinə yüksəlmişdir. Bu şəhidlərimizdən biri də Salatın Əsgərovadır.

Salatın Əziz qızı Əsgərova 1961-ci il dekabr ayının 16-da Bakı şəhərində anadan olmuşdur. Salatın Əsgərovanın gələcək fəaliyyətinin formalaşması onun ailəsi ilə bağlı idi. O, ziyalı ailəsində anadan olmuşdu. 1979-cu ildə Bakıda Mikayıl Müşfiq adına 18 nömrəli tam orta məktəbi bitirmişdir. Elə həmin il Azərbaycan Neft və Kimya İnstitutuna (indiki Azərbaycan Dövlət Neft və Sənaye Universiteti) qəbul olunmuşdur .

Salatın Əsgərovanın jurnalistikaya böyük marağı var idi. Onun jurnalist kimi fəaliyyəti "Bakı" qəzeti ilə başlayıb. 1988-ci ildə isə "Molodyoj Azərbaydjana" qəzetində fəaliyyət göstərib. Salatın Əsgərova olduqca vətənpərvər ruhda böyümüşdü və 90-cı illərin hadisələri ona təsir etmişdi. Elə buna görə də həmişə "odlu nöqtələrdən" yazırdı. Salatın Əsgərova həmişə öz Vətəninə sadiq olmuşdur. Elə buna görə də 1990-cı ilin 20 Yanvar faciəsi, eləcə də Qarabağda ermənilərin azərbaycanlılara olan hücumu zamanı əsl vətəndaş mövqeyi nümayiş etdirmişdir.

Salatın Əsgərova 1991-ci il yanvarın 9-da erməni terrorçuları tərəfindən qətlə yetirilib. Azərbaycanın Milli Qəhrəmanı Salatın Əsgərova 20 Yanvar şəhidləri ilə Qarabağ şəhidləri arasına körpü salan bir Azərbaycan qızıdır…

Xalqımız Salatın Əsgərovanın xatirəsini əziz tutur. Paytaxtımızın küçələrindən biri Salatın Əsgərovanın adını daşıyır. Onun fəaliyyətini yazıçılar, şairlər, musiqiçilər, rəssamlar, heykəltəraşlar layiqincə qiymətləndirirlər.

**Zülfiyyə Hüseynova,**
**Tarix və coğrafiya fakültəsinin**
**lll tədris ili tələbəsi**

*Müəllimlərimiz yazırlar*

# Pedaqoji kadr hazırlığı ilə bağlı təkliflər və mülahizələr

**Müəllimlər yaşadıqları cəmiyyətin güzgüsü və onun hərəkətverici qüvvəsidir. Müəllim adı həmişə müqəddəs olmuş, müəllimlər xalqın maariflənməsində, inkişafında əvəzsiz rol oynamışlar. Xüsusilə, pedaqoji universitetlərdə çalışan bu şərəfli peşə sahibləri cəmiyyət üçün saysız-hesabsız layiqli kadrlar, müxtəlif fənlər üzrə çox savadlı və yüksək intellektli, əsl vətənpərvər müllimlər ordusu hazırlamışlar. Buna görə pedaqoji universitetlərin müəllimlərinə çox vaxt, düzgün olaraq, "müəllimlər müəllimi" də deyirlər.**

Ulu öndər Heydər Əliyev demişdir: "Mən Yer üzərində müəllimdən yüksək ad tanımıram". Dahilərdən biri də belə bir fikir söyləmişdir ki, əgər bir xalqı, bir milləti məhv etmək istəyirsənsə, onun müəllimlərini savadsız yetişdirmək kifayət edir. Onda o millət öz-özünə məhv olacaq və müharibə etməyə belə ehtiyac qalmayacaq.

Müəllimlik peşəsi nə qədər şərəfli və yüksək olsa da, bir o qədər məsuliyyətli və çətindir. Bu baxımdan, müəllimlər ordusu hazırlayan pedaqoji universitetlərin üzərinə çox böyük məsuliyyət düşür. Dövlətin hər hansı bir sahədə: hərbi, iqtisadi, sosial və s. qüdrətli olması cəmiyyətdəki müəllimlərdən birbaşa asılıdır. Belə ki, bağçadakı tərbiyəçi müəllimədən başlayaraq universitetdə mühazirə oxuyan müəllimlərədək bütün müəllimlər sanki, cəmiyyətin barometridir. Onlar yüksək biliyə, intellektə malik olsalar, cəmiyyət üçün savadlı, mədəni, ədalətli, bacarıqlı vətəndaşlar yetişdirəcək, həmin vətəndaşlar da öz növbəsində, normal cəmiyyət, iqtisadi və hərbi cəhətdən çox qüdrətli bir dövlət quracaqlar. Məhz buna görə cəmiyyət üçün müəllimlər hazırlayan pedaqoji universitetlərdə təhsil son dərəcə keyfiyyətli və hərtərəfli olmalı, daim xalqın, millətin, Vətənin rifahı naminə çalışan müəllimlər ordusunun yetişdirilməsi işinə xidmət etməlidir. Universitetlərdəki tədrisin əsas qayəsi də məhz bundan ibarət olmalıdır.

Pedaqoji universitetlərin bugünkü tələbələrinin sabahın müəllimlərinə çevrilməsində və pedaqoji kadrların müasir tələblər səviyyəsində hazırlanmasında əsas amillərdən hesab olunan tədrisin cox böyük rolu vardır. Buna görə də tədrisin keyfiyyətini yaxşılaşdırmaq üçün hər bir fənn müəllimi çox böyük məsuliyyət daşımalıdır. Belə ki, hər bir fənn müəllimi ilk növbədə:

1) Yüksək nəzəri biliyə malik olmalıdır. Bu nəzəri bilikləri o, dərs dediyi tələbələrə pedaqoyi ustalıqla, müasir tədris metodlarından istifadə etməklə izah etməlidir. Bunun üçün onlar müasir dərsliklərdən və vəsaitlərdən, İnternet materiallarından və s. istifadə etməklə yüksək səviyyəli və zəngin məlumatlı mühazirələr hazırlamalıdırlar. Yaxşı olardı ki, mühazirələrin elektron versiyaları da tərtib olunsun və monitorlarda elektron qələmlərlə izahatlar verilsin.

2) Yüksək praktik biliyə malik olmalıdır ki, tələbələrə praktik vərdişlər əsasında təbii xammallardan xalqın rifahı naminə istifadə etməyin sirlərini öyrətsinlər.

3) İstər orta məktəb, istərsə də ali məktəb kimya müəllimləri neft və qaz ölkəsi olan Azərbaycan Respublikasının zəngin təbii ehtiyatlara malik olduğunu və bu ehtiyatlardan səmərəli istifadə etməyin yollarını axtarmalı və tələbələrin diqqətini bu sahəyə cəlb etməlidirlər.

4) Təbiətdə hazır şəkildə xammal kimi olan maddələrin xassələrini öyrənməli və onlardan insanların ehtiyacı üçün istifadə etməyi bacarmalı və bu bacarıqları gələcək gənc nəslə aşılamalıdırlar.

5) Yeri gəldikcə, dərs dediyi şagird və tələbələrə öz fənninin sirlərini öyrətməklə yanaşı, onların öz xalqını, dövlətini, Vətənini sevən vətəndaşlar kimi yetişməsinə yardımçı olmalıdır. Milli sərvətlərin, təbii xammalların bu ruhda istifadəsi tələbələrə aşılanmalı, təbliğ olunmalıdır.

6) Daim öz üzərində işləməli, nəzəri və praktik biliklərini genişləndirməlidir. Hər kafedra həftənin məlum bir günündə seminarlar, elmi diskussiyalar təşkil etməli, müntəzəm surətdə açıq dərslər aparılmalı və lazım gələrsə, fakültənin qabaqcıl və əlaçı tələbələri də bu proseslərə cəlb olunmalıdır.

Bütün bunlarla yanaşı:

a) Vaxtaşırı müəllimlərin attestasiyaları kçirilməli və onların daim öz biliklərini müasir standartlar səviyyəsinə çatdırmaları stimullaşdırılmalıdır.

b) Vaxtaşırı müəllimlərin təkmilləşməsini təmin etmək lazımdır ki, onların bilik səviyyələri müasir tələblərə uyğun olsun.

c) Fənn olimpiadaları təşkil olunmalı və hər tədris ili tələbələri üçün onların keçdikləri tədris materiallarına uyğun suallar tərtib olunmalı və qaliblər mükafatlandırılmalıdır.

d) Tələbə elmi cəmiyyətlərinin fəaliyyəti genisləndirilməli, lazım gələrsə, bu sahədə həvəsləndirici prinsiplərdən istifadə edilməli, ən yaxşı və yaradıcı tələbə elmi işləri üçün mükafatlar təsis olunmalıdır.

e) Vaxtaşırı kollokviumlar və yoxlamalar təşkil olunmalı, tələbələrin aldıqları nəzəri və praktik biliklər obyektiv qiymətləndirilməlidir.

f) Dekanlıqlara tapşırılmalıdır ki, gənclər təşkilatı ilə birlikdə tələbələrlə nizam-intizama ciddi riayət etmələri, mühazirələrə diqqətlə qulaq asmaları və yüksək bilik əldə etmək üçün bütün mümkün variantlardan istifadə etmələri, öz xalqının ən layiqli müəllimi kimi yetişmələri barədə təbliğat və təşviqat xarakterli işlər aparılsın.

Pedaqoji kadrların hazırlanmasında nəzərə almaq lazımdır ki, Pedaqoji Universitetin müəllimləri "müəllimlər müəllimi" olduqlarından, cəmiyyət üçün xeyirli müəllimlər ordusu hazırlamaq işində onlar çox böyük məsuliyyət daşıyır və buna görə də yuxarıdakı tələblər, ilk növbədə, onların özlərinə bilavasitə aid edilməlidir. Universitetdə təhsil alan tələbələri cəmiyyətin əsl hərəkətverici qüvvəsi kimi, xeyirxah və bacarıqlı vətəndaş kimi yetişdirmək üçün tədris cox keyfiyyətli və düzgün istiqamətdə qurulmalı, Pedaqoji Universitetin indiki tələbələrini sabahın savadlı və yüksək intellektli müəlliminə çevirmək üçün əsasən, aşağıdakılara əməl olunmalıdır :

1. Ədalətli bir cəmiyyətin vətəndaşarı olmaları üçün tələbələrə seçdikləri ixtisas fənnləri dərindən, peşəkarcasına və müasir tələblərə cavab verə biləcək şəkildə tədris olunmalıdır. Çünki savadlı adam heç bir zaman ədalətsiz ola bilməz.

2.Vətəndaş həmrəyliyi ruhunda xalqına, millətinə, Vətəninə daim sadiq qalan əsl vətənpərvər bir ziyalı ordusu yetişdirilməsi işinə xidmət edilməlidir.

3.Müasir həyatı dərindən dərk edərək, gənc nəslə düzgün istiqamətdə təhsil verə bilən, savadlı və yüksək intellektli müəllimlər ordusunun yaradılması işinə xidmət edə bilən tədris planı hazırlanmalıdır.

4.Semestr imtahanları əgər test üsulu ilə keçirilərsə, açıq testlərə (xüsusilə, dəqiq fənnlərdə) üstünlük verilməlidir.

Bu deyilən istiqamətlərdə işin qurulması üçün tədrisə məhz peşəkar, öz fənnini dərindən bilən, tələbələrin psixologiyasını, müasir pedaqogikanı mükəmməl bilən vicdanlı müəllimlər cəlb olunmalıdır. Pedaqoji universitetlərdə məhz keyfiyyətli tədrisin olması savadlı və yüksək intellektli müəllimlərin yetişdirilməsinə, cəmiyyətin saflaşmasına, elmi-texniki tərəqqiyə və ümumiyyətlə, əsl vətəndaş cəmiyyətinin yaranmasına gətirib şıxara bilər. Bunun üçün tədris prosesində bütün mümkün vasitələrdən, interaktiv tədris metodlarından və s. səmərəli istifadə edilməli, keyfiyyətli tədrisin istiqamətlərinin və strategiyasının göstərilməsinə çalışılmalıdır. Məhz tədrisin müasir tələblər səviyyəsində qurulması, onun keyfiyyətinin yüksəldilməsi savadlı müəllimlər ordusunun yaradılmasına və bununla əlaqədar olaraq, bütövlükdə cəmiyyətin saflaşmasına və sonda onun iqtisadi, hərbi, sosial və s.sahələrdə qüdrətinin artmasına gətirib çıxarar.

Beləliklə, yuxarıda deyilənlərdən belə bir nəticəyə gəlmək olar ki, doğrudan da, pedaqoli kadrların hazırlanmasına sinergetik yanaşaraq, pedaqoji universitetlərin bugünkü tələbələrinin sabahın müasir, savadlı və yüksək intellektli vətənpərvər müəllimlərinə çevrilməsində qeyd olunan istiqamətlər üzrə ciddi işlər aparılmalı və pedaqoji kadrlar məhz bu istiqamətlər üzrə hazırlanmalıdır.



**Nizami Əkbərov,**
**Analitik və üzvi kimya kafedrasının dosenti**

# İctimai Şura ADPU-nun nəzdində ADPK-də imtahan sessiyasını müşahidə edib

Yanvarın 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İctimai Şurasının üzvləri ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) imtahan sessiyasını müşahidə ediblər. Öncə ADPK-nin direktoru, dosent İsrayıl İsgəndərov çıxış edərək kollecin əsas fəaliyyət prinsiplərinin şəffaflıq, idarəetmənin optimallaşdırılması və tədrisin keyfiyyətinin müasir tələblərə uyğunlaşdırılması olduğunu, bu prinsiplərin tələb etdiyi əsas yanaşmalardan birinin isə vətəndaş cəmiyyəti institutları, təhsil ekspertləri və media ilə sıx əməkdaşlığın qurulmasının olduğunu bildirib. Qeyd edib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müəyyən etdiyi vəzifələrdən biri də ictimai nəzarətin həyata keçirilməsinə şərait yaradılmasıdır. Təhsil naziri Ceyhun Bayramovun imtahan sessiyasının təşkili və keçirilməsi barədə imzaladığı müvafiq əmrdə imtahan sessiyasında şəffaflığın təmin olunması üçün imtahanlarda ictimayyət nümayəndələrinin və valideynlərin iştirakına şərait yaradılması qeyd edilmişdir. Bütün bunları nəzərə alaraq kollecdə tədris və imtahan prosesində ictimai nəzarətin təmin olunmasına xüsusi önəm verilir.



İctimai Şuranın sədri, Azərbaycan Mətbuat Şurasının sədr müavini, Beynəlxalq Avrasiya Mətbuat Fondunun prezidenti Ümid Mirzəyev bildirib ki, İctimai Şuranın qarşısında duran əsas məqsəd imtahan sessiyasının şəffaf keçirilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində obyektivliyin təmin olunması ilə bağlı ictimaiyyəti məlumatlandırmaqdır. İctimai Şuranın üzvləri tədris prosesi ilə bağlı təkliflərlə çıxış ediblər.

Sonra imtahanlara nəzarət edən müəllim-koordinatorların bölgüsü ilə tanış olan İctimai Şuranın üzvləri kollecin monitorinq otağında olub, auditoriyalarda keçirilən imtahan prosesini izləyiblər. Qeyd edək ki, imtahan sessiyasının gedişinə nəzarət etmək, tələbələrin və valideynlərin, həmçinin ictimaiyyətin müraciətlərinin qəbulu və araşdırılması məqsədilə İmtahan Qərargahı və Apelyasiya Komissiyası fəaliyyət göstərir. İmtahanın təşkilindən narazı qalan tələbələrin İmtahan Qərargahına, qiymətləndirmədən narazı qalan tələbələrin isə Apelyasiya Komissiyasına müraciət etmələri üçün lazımi şərait yaradılıb.

İctimai Şuranın üzvləri kollecdə görülən işləri yüksək qiymətləndirib, imtahanların şəffaf və obyektiv keçirilməsini təqdir edib, tələbələrə öz biliklərini nümayiş etdirmək üçün yaradılan şəraitdən məmnunluq ifadə ediblər.

# ADPU-nun Şamaxı Filialında 20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünə həsr olunmuş tədbir



**20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünün keçirilməsilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında Tədbirlər planı təsdiq olunmuş və həmin plana əsasən silsilə tədbirlər həyata keçirilmişdir.**

Həmin Tədbirlər planına uyğun olaraq filialın kitabxanasında 20 Yanvar faciəsi şəhidlərinin xatirəsinə həsr olunmuş guşə yaradıldı.

Tədbirlər planının müvafiq bəndinə uyğun olaraq yanvarın 16-da faciənin tarixi faktlarını bir daha tələbə-gənclərin diqqətinə çatdırmaq məqsədilə mühazirələr təşkil olundu. Ictimai və xüsusi fənlər kafedrasının əməkdaşları tərəfindən təşkil olunan mühazirələrdə ilk olaraq 20 Yanvar gecəsində azadlıq uğrunda canından keçmiş şəhidlərimizin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edildi. Sonra o faciəli, dəhşətli, qanlı hadisələr zamanı silahlanmış imperiya ordusunun əliyalın dinc əhaliyə, azadlıq, müstəqillik arzusunda olan insanlara qanlı divan tutmasından danışıldı.

Kafedranın müdiri, dosent Mayıl Alıcanov 20 Yanvar faciəsinə ilk siyasi-hüquqi qiymətin məhz ümummilli lider Heydər Əliyev tərəfindən verildiyini diqqətə çatdırdı. Dərslərdə o da qeyd olundu ki, 20 Yanvar şəhidlərinin qəhrəmanlığı Azərbaycan xalqı üçün, Azərbaycan gəncləri üçün örnəkdir. Azərbaycanın bugünkü gənc nəsli də, gələcək nəsillər də şəhidlərin qəhrəmanlığından nümunə götürməlidirlər.

Yanvarın 19-da filialın Tələbə Gənclər Təşkilatının fəal üzvləri Şamaxı rayonunda yerləşən Şəhidlər Xiyabanında şəhid məzarlarının və faciə qurbanlarının xatirəsinə ucaldılmış abidənin önünə tər qərənfillər düzərək şəhidlərimizə olan hörmət və ehtiramlarını ifadə etdilər.

Yanvarın 20-də filialın rəhbərliyi başda olmaqla, professor-müəllim heyəti Şamaxı Rayon İcra Hakimiyyətinin və rayon ictimaiyyətinin nümayəndələri ilə birlikdə Şəhidlər Xiyabanını ziyarət etdilər.

# ADPU-nun Quba Filialında 20 Yanvar faciəsi qurbanlarının xatirəsi yad edilib

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında 20 Yanvar faciəsinin iyirmi doqquzuncu ildönümünə həsr olunmuş bir sıra tədbirlər həyata keçirilib. Belə ki, filialın "Oxucu" divar qəzetində 20 Yanvar faciəsi ilə əlaqədar yazılan məqalələr öz əksini tapıb.**




Yanvarın 15-də filialın Tələbə Gənclər Təşkilatının (TGT) və Tələbə Elmi Cəmiyyətinin (TEC) birgə təşkilatçılığı ilə fəal tələbələr Quba şəhərində yerləşən Şəhidlər Xiyabanını ziyarət edib, şəhid məzarları üzərinə gül dəstələri qoyub və Quba şəhidlərinin qəhrəmanlıq yolunu əks etdirən məlumatlar saxlanılan muzeylə tanış olublar.

Yanvarın 16-da faciənin tarixi faktlarını bir daha tələbə-gənclərin diqqətinə çatdırmaq məqsədilə filialın Ədəbiyyat və dillər, Pedaqoji və ictimai fənlər kafedralarının əməkdaşları tərəfindən mühazirələr təşkil olunub.

Yanvarın 16-da filialda həmçinin "Unutma, unutdurma!" adlı tədbir keçirilib.Tədbirdə filialın direktoru, professor Əli Allahverdiyev 20 Yanvar hadisələrinin canlı şahidi kimi imperiya ordusunun əliyalın dinc əhaliyə qanlı divan tutmasından danışıb, 20 Yanvar faciəsinin əslində qəhrəmanlıq tariximiz olduğunu xüsusi vurğulayıb.

Yanvarın 20-də filialın rəhbərliyi başda olmaqla, professor-müəllim heyəti Quba Rayon İcra Hakimiyyətinin və rayon ictimaiyyətinin nümayəndələri ilə birlikdə Şəhidlər Xiyabanını ziyarət edib, şəhid məzarlarının və faciə qurbanlarının xatirəsinə ucaldılmış abidənin önünə tər qərənfillər düzərək şəhidlərimizə olan hörmət və ehtiramlarını ifadə ediblər.

# ADPU-nun Şəki Filialında "ADA Universitetinin tanıtım layihəsi" çərçivəsində seminar

Yanvarın 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında "ADA Universitetinin tanıtım layihəsi" çərçivəsində seminar keçirilib. Tədbirdə ADA Universitetinin əməkdaşları Şəbnəm Qəhrəmanova, Mühəndislik fakültəsinin professoru, texnika üzrə fəlsəfə doktoru Vüqar Musayev, siyasi elmlər üzrə fəlsəfə doktoru, dosent Anar Vəliyev iştirak ediblər.

Tədbiri giriş sözü ilə açan filialın direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rasulov seminarın mövzusu və əhəmiyyətindən bəhs edib.

ADA Universitetinin əməkdaşları Şəbnəm Qəhrəmanova, Vüqar Musayev və Anar Vəliyev çıxış edərək ADA Universitetinin yaranma tarixi, fakültə və ixtisasları. qəbul qaydaları, professor-müəllim və tələbə heyəti, maddi-texniki bazası haqqında ətraflı məlumat veriblər. Açıq fikir mübadiləsi şəraitində keçən seminarda tələbələri maraqlandıran çoxsaylı suallar cavablandırılıb, karyera yüksəlişi üçün zəruri olan tələblər barədə geniş izahatlar verilib.

Görüş tələbələrin dərin marağı və fəallığı şəraitində başa çatıb.

## Allah rəhmət etsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İnsan və heyvan fiziologiyası kafedrasının professoru

**Tamilla Feyzullayevanın**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının müdiri, professor İramin İsayevə qardaşı

**Fərhad İsayevin**

vəfatından kədərləndiyini bildirir, dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan tarixi kafedrasının baş müəllimi

**Bəşir Quliyevin**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.


Redaktor: Günay BAĞIRLI

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 455
Sayı: 1500
Çapa imzalanıb: 31.01.2019-cu il

ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsində yığılıb, "Azərbaycan" Nəşriyyatında səhifələnib və ofset üsulu ilə çap edilib.